# ƏHLÜS-SÜNNƏT NƏZƏRİNDƏ SƏHABƏ

**Müaviyə'nin misalında sünni alimlərinin mövqeyi**



Yazımızı bu şəkildə yaymaq istəmirdik. Amma uzun zamandan bəri yarımçıq saxladığımız bir çalışma olduğunu və bəzi qardaşlarımızın xahişini nəzərə alaraq bu şəkildə yayılmasına razı olduq.

Buradakı bəhsimiz sadəcə bir sual ətrafında dövr edir. Əhlüs-sünnət olaraq tanınan, məşhur olan alimlərin ümumilikdə səhabələrə, xüsusilikdə isə Müaviyə'yə münasibətləri necə olub? Bu araşdırmamızda hər şeydən öncə səhabələrdəki səhabə məfhumuna toxunacağıq, daha sonra səhabələrin nəzərində Müaviyəyə olan münasibəti ələ alacağıq. Daha sonra Müaviyənin bəzi şəxsi özəlliklərini qeyd edirik. Daha sonra dörd məzhəbin alimlərinin hamısının fikrini qələmə almaq istəsək də bunun üçün taqət tapa bilmədik, ona görə də yalnız hənəfi alimlərinin bu barədə sözləri ilə kifayətləndik.

"**Onlar bir camaat idilər ki, keçib getdilər. Onların etdikləri əməllər özlərinə, sizin etdiyiniz əməllər isə sizə aiddir. Onların əməlləri barəsində sizdən sorğu-sual olunmaz.**"

## SƏHABƏ STATUSU

Muhəmməd bin Sad "ət-Tabəqat" kitabında deyir: "**Əli bin Muhəmməd bizə Şubədən, o da Musa əs-Səbəlani'dən (və ya əs-Sunbulani'dən) belə dediyini rəvayət edir: "Ənəs bin Malik'in yanına gəldim və ondan soruşdum: "Sən Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səhabələrindən ən sonuncu qalansan?" Dedi: "Bədəvilərdən bir qrup qalıb, amma onun yoldaşlarına gəldikdə isə mən onlardan qalan ən axırıncıyam.**"[1] İbnus-Salah bu xəbəri zikr etdikdən sonra isnadının ceyyid olduğunu deyir. Bəziləri bu xəbəri zikr edərək deyirlər ki, Ənəs bin Malik peyğəmbəri - aleyhissalətu vassələm - görmüş hər kəsi səhabələrdən hesab etməmişdir. Amma həqiqətdə bu xəbər bu iddianı edənlərə qarşı dəlildir, çünki sualı verən Ənəs'dən səhabələrdən ən axırıncı qalanın o olub olmadığını soruşur. Belə bir sualın cavabında Ənəsin "bədəvilərdən bir qrupun qaldığını" xəbər verməsi onu göstərir ki, hətta Ənəs bin Malikə görə də peyğəmbəri – salləllahu aleyhi va səlləm – görüb ona iman etmiş bədəvilər ümumi səhabə adına daxildirlər. Əgər belə olmasaydı o sualın qarşılığında bunu qeyd etməsinin bir mənası olmazdı. Ona görə də hənəfi alimlərindən Əbu Muhəmməd Muhyiddin Abdulqadir bin Muhəmməd əl-Quraşi (h. 696-775) Əbu Hənifə'nin səhabələri görməsi səbəbilə tabiin nəslindən olduğunu sübut etmək üçün Ənəsin bu sözlərini peyğəmbəri – aleyhissələm – görüb ona iman etmiş hər kəsin səhabə olmasına dəlil olaraq görür və deyir: "**Beləliklə də (Ənəs) səhabələr adını onu görmüş hər kəsə aid etdi və biz bu məsələni Şərhun-Nuxbə kitabının şərhində təhqiq etmişik.**"[2] Burada deyilə biləcək ən uzaq söz bu ola bilər ki, Ənəs səhabələr arasından peyğəmbərə yoldaşlıq edənlərlə, sadəcə onu görüb iman edənlər arasında fərq qoymuşdur. Bu fərqlər onsuz da Quranın təsdiq etdiyi fərqlərdir və bilirik ki, ənsarlar fəzilətdə mühacirlərlə eyni deyildir, eləcə

[1] "Kitəb ət-Tabəqat əl-Kəbir", 5/348;

[2] "əl-Cəvahir əl-Mudiyyə fi Tabəqat əl-Hənəfiyyə", 2/453;

də Məkkənin fəthindən öncə iman edənlərlə sonra iman edənlər də fəzilət baxımından eyni deyillər. Buna görə də İmam İbn Kəsir əd-Diməşqi (h. 701-774) deyir: “**Burada sadəcə olaraq xüsusi səhabəliyi nəfy etmişdir, Allahın elçisinin – salləllahu aleyhi va sələm – şərəfi səbəbi ilə mücərrəd olaraq onu görməyin səhabə adı üçün kifayət edəcəyinə dair cumhurun üzərində razılaşdığı tərifi nəfy etmir.**”[3] Həmçinin Hafiz Zeynuddin Əbul-Fədl Abdurrahim bin əl-Huseyn əl-İraqi (h. 725-806) deyir: “**O, bu sözü ilə həmin bədəvilərdə olmayan xüsusi səhabəliyi isbat etmək istəmişdir...**”[4] Bu sözlərin bənzərini Şəmsuddin Əbul-Xayr əs-Səxavi (h. 831-902) “Fəthul-Muğis” kitabında zikr edir. Ənəsin sözlərini Müaviyə ilə əlaqələndirsək çox rahatlıqla deyə bilərik ki, Müaviyə peyğəmbəri görmüş bədəvilərin sırasına deyil, məhz ona yoldaşlıq etmiş səhabələrin sırasına daxildir.

Səhabə statusunun dəyərli və imtiyazlı bir status olduğu səhabələrin özləri tərəfindən də təsdiqlənir. İmam Əhməd deyir: “**Vaki bizə rəvayət etdi; Sufyan (əs-Səvri) bizə Nuseyr bin Zu’luqdan belə dediyini rəvayət etdi: “İbn Öməri belə deyərkən eşitdim: “Muhəmmədin əshabını söyməyin, çünki onların (peyğəmbərlə) bir saat məqamı sizin qırx il ibadətinizdən xeyirlidir.**”[5] Bu xəbərin İbn Ömərdən səhih olduğunu İbn Həcər, əl-Busiri, əl-Heysəmi və digərləri təsdiqləyirlər. Alimlər burada “bir saat məqamı” peyğəmbərin – aleyhissələm – itaəti altında cihad etməklə təfsir ediblər. Abdullah bin Ömər’in bu sözlərini həmçinin cənnətlə müjdələnmiş on səhabədən biri olan Said bin Zeyd də təsdiqləyir. Əbu Davud’un “əs-Sünən” kitabında səhih isnad ilə rəvayət etdiyi bir hədisdə Said –radiyallahu anhu – Əli bin Əbi Talibi – kərraməllahu vachəhu - söyən birinə deyir: “**And olsun ki, onlardan bir nəfərin Allahın elçisi ilə - salləllahu aleyhi va sələm – döyüşdə iştirak edib üzünü toza bulaması sizdən birinin ömrü boyu – hətta ona Nuhun ömrü qədər ömür verilsə belə - etdiyi əməllərindən daha xeyirlidir.**”[6] Əgər səhabəlik statusu özlüyündə böyük bir fəzilət, böyük bir şərəf olmasaydı İbn Ömərin və Said bin Zeyd’in sözlərinin bir mənası olmazdı, çünki ömrü boyu saleh əməl edən insan, ömrü boyu Allah

[3] “İxtisar Ulumil-Hədis”, səh: 276;
[4] “Şərhut-Təbsirati vat-Təzkira”, 2/124;
[5] “Fədailus-Sahabə”, (15, 20, 1729, 1736);
[6] “Sünən Əbi Davud”, (4650)

yolunda cihad edən bir insan məhz o məqamdan məhrum olduğu üçün xeyirdə səhabədən aşağı görülmüşdür. Bir kimsə “bu şeylər mənim ağlıma batmır” deyərək bu etiqadı rədd edə bilər, amma bu etiqadın Said bin Zeyd kimi böyük səhabələrin etiqadı olduğunu isə inkar edə bilməz.

## MÜAVİYƏ VƏ SƏHABƏ MƏQAMI

Ümumiyyətlə əhlüs-sünnət məzhəblərində Müaviyəyə bir səhabə olaraq münasibət səhabələrin özlərinin ona münasibətinə müvafiqdir. Əli bin əl-Ca’d deyir: “**Zuheyr bizə əl-Əsvad bin Qeys’dən, o da Nubeyh əl-Ənzi’dən belə dediyini rəvayət etdi: “Əbu Said əl-Xudri’nin yanında idik. Əli bin Əbi Talib və Müaviyə zikr olundu və Müaviyəni söydülər. (Əbu Said) uzanmış halda idi, dikəlib oturdu və dedi: “Biz peyğəmbərin - salləllahu aleyhi va səlləm – yanında yoldaşlıq dəstələri ilə olardıq, fılankəs ilə bir dəstə, Əbu Bəkr ilə bir dəstə. (Bir dəfə) mən Əbu Bəkrin yoldaşlıq dairəsində idim və bir evdə qonaq olduq; qadınların arasında bir hamilə qadın var idi və bizim yanımızda səhra əhlindən bir kişi var idi. Həmin bədəvi o qadına dedi: “Əgər oğlan uşağının olmasını istəyirsənsə mənə bir qoyun ver!” Ona bir qoyun verdi, o da onun üçün bir şeylər yazdı. Sonra gedib qoyunu kəsdi və onu bişirdi. Sonra oturub yeməyə başladılar və qoyunun necə əldə edildiyini müzakirə etdilər. Bunun üzərinə Əbu Bəkri bir kənara çəkilib özünü qusdurarkən gördüm. Daha sonralar həmin bədəvinin Ömərin yanına gətirildiyini gördüm; ənsarlara dil uzatmışdı. Ömər dedi: “Əgər onun Allahın elçisindən – salləllahu aleyhi va səlləm – səhabəliyi/yoldaşlığı olmasaydı sizi ondan qurtarmışdım, amma onun səhabəliyi var.**”[7] İbn Həcər – rahmətullahi aleyhi – bu xəbəri zikr etdikdən sonra deyir: “**Bu hədisin raviləri siqadırlar. Ömər – radiyallahu anhu – onu cəzalandırmaq bir kənarda qalsın, onu acılamaqdan da çəkindi, çünki onun peyğəmbərlə - salləllahu aleyhi va səlləm – görüşdüyünü bilirdi. Bu xəbərdə ən aşkar şahidlik vardır ki, onlar səhabə statusuna heç bir şeyin çatmayacağına inanırdılar.**”[8] Bu xəbərdən çıxara biləcəyimiz fayda budur ki, Ömər – radiyallahu anhu – peyğəmbəri görmüş, ona iman

---

[7] “Musnəd İbn əl-Cə’d” (2657);

[8] “əl-İsabə fi Təmyizis-Sahabə”, 1/165;

etmiş səhabələrin xüsusi statusa sahib olduqlarına inanıb. Daha da maraqlısı budur ki, Əbu Said əl-Xudri kimi səhabə də bunu misal verərək Müaviyənin söyülməyinə etiraz edir. Əbu Said səhabələrin fəqihlərindən, müctəhidlərindəndir. Ridvan beyətində iştirak etmiş və Allahın razılığını qazanmış səhabələrdəndir. Qısacası Müaviyə hər bir tərəfdən peyğəmbərin – salləllahu aleyhi va səlləm – yoldaşı, səhabəsi kateqoriyasına daxil olur, yəni Ənəsin qəsd etdiyi səhabələr sinfinə girir. Müaviyə'nin peyğəmbərə yoldaşlıq etmiş səhabə olduğunu hətta İbn Abbas da təsdiqləyir. əl-Buxari "əs-Sahih" kitabında deyir: "**əl-Həsən bin Buşr bizə rəvayət etdi; əl-Muafi bizə Osman bin əl-Əsvad'dən, o da İbn Əbi Muleykə'dən belə dediyini rəvayət edir: "Müaviyə işə namazından sonra bir rükətlə vitr etdi və yanında İbn Abbas'ın mövlası var idi. Bir az sonra İbn Abbas gəldi və (ona) dedi: "Onu burax, çünki o, Allahın elçisinə - salləllahu aleyhi va səlləm – yoldaşlıq edib.**"[9] Hənəfi üləmasından Bədruddin Mahmud bin Əhməd əl-Ayni (h. 762-855) bu hədisi şərh edərkən İbn Abbasın "onu burax" sözləri haqqında deyir: "**Yəni onun haqqında danışmağı, ona qarşı inkar etməyi burax, çünki o, Allahın elçisinə - salləllahu aleyhi va səlləm – yoldaşlıq edib və o, fiqhi bilir.**"[10] Şərəfuddin əl-Huseyn bin Muhəmməd ət-Tibi (vəfatı hicri 743) deyir: "**Bu sözlərdə ümmətin aliminin Müaviyə üçün onun fəziləti, səhabəliyi və ictihadına dair şahidliyi vardır.**"[11] Müaviyənin fəqihliyinə, onun peyğəmbərin sünnətinə tabe olmaqdakı diqqətinə şahidlik edən səhabələrdən biri də Əbud-Dərda'dır. ət-Tabərani deyir: "**İbrahim bin Duheym əd-Diməşqi bizə rəvayət etdi; atam bizə rəvayət etdi: əl-Valid bin Muslim bizə rəvayət etdi; Said bin Abdilaziz bizə İsmail bin Ubeydilləh'dən, o, Qeys bin əl-Həris'dən, o isə əs-Sunnəci'dən, o da Əbud-Dərdə'dən belə dediyini rəvayət edir: "Namazında peyğəmbərə - salləllahu aleyhi va səlləm – sizin bu əmirinizdən – Müaviyəni qəsd edir – daha çox bənzəyən birini görmədim.**"[12] Bunu əz-Zəhəbi də "əs-Siyər" kitabında zikr edir[13] və Şeyx Şueyb Arnavut'un nəzarəti altında kitabı təhqiq edənlər ravilərinin siqa olduğunu deyirlər. Namaz İslamın ən əzəmətli

---

[9] "Sahih əl-Buxari", 3764;
[10] "Umdətul-Qari Şərh Sahih əl-Buxari", 16/248;
[11] "Şərhul-Mişkət", 4/1227;
[12] "Musnəduş-Şəmiyyin", 1/169 (283);
[13] "Siyər Əaləmin-Nubələ", 3/135;

ibadətlərindəndir və Müaviyənin namazının peyğəmbərin namazına bənzədilməsi bir daha göstərir ki, o, ibadətlərinə fikir verən, sünnətə riayət edən biri idi. Əbud-Dərdə'nin Müaviyə haqqında daha bir şahidliyi vardır. Əbu Davud "əs-Sünən" kitabında rəvayət edir: "**İsa bin Muhəmməd ər-Ramli  və İbn Auf – bu, onun ləfzidir – bizə rəvayət etdilər; dedilər: əl-Firyəbi bizə Sufyan'dan, o da Səvr'dən, o da Raşid bin Sad'dan, o isə Müaviyə'dən belə dediyini rəvayət edir: "Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Sən əgər insanların gizli eyiblərini axtarıb üzə çıxarmağa çalışsan onları pozarsan və ya az qala onları pozarsan." Əbud-Dərdə dedi: "Bu, Müaviyənin Allahın  elçisindən eşitdiyi, onunla Allahın ona fayda verdiyi bir kəlimədir".**"[14] Əbu Davud'un səhih sənədlə rəvayət etdiyi bu xəbərdə Əbud-Dərdə peyğəmbərin sözlərinin Müaviyəyə fayda verdiyinə şahidlik edir. Peyğəmbərin bu nəsihətini Müaviyənin öz həyatında, öz riyasətində tətbiq etdiyini görmədən belə bir şahidlik etmək yalan olardı. Zühdü və təqvası ilə tanınmış bu ənsarlı səhabə'nin sözündəki səmimiyyətinə inanmamağa bir səbəb yoxdur. İbn Kəsir də onun bu sözlərini şərh edərkən deyir: "**(Əbud-Dərdə) qəsd edir ki, o, gözəl bir yaşam tərzinə sahib idi, çox gözəl bir tərzdə (insanlara) güzəşt edərdi, gözəl bir şəkildə əfv edərdi və (insanların) eyiblərini örtərdi. Allah ona rəhm etsin!**"[15]

ət-Tirmizi "əl-Cami" kitabında deyir: "**Muhəmməd bin Yəhya bizə rəvayət edir; Abdullah bin Muhəmməd ən-Nufeyli bizə rəvayət etdi; dedi: Amr bin Vaqid bizə Yunus bin Həlbəs'dən, o da Əbu İdris əl-Xavləni'dən belə dediyini rəvayət edir: "Ömər bin əl-Xattab Hims şəhərinin valiliyindən Umeyr bin Sad'ı çıxardıqda yerinə Müaviyəni təyin etdi; bunun üzərinə insanlar dedilər: "Umeyri çıxartdı, Müaviyəni təyin etdi." Umeyr dedi: "Müaviyəni xeyirdən başqası ilə zikr etməyin, çünki mən Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitmişəm: "Allahım! Onunla hidayət et!**" ət-Tirmizi hədisi qeyd etdikdən sonra deyir: "**Bu, ğarib bir hədisdir və Amr bin Vaqid zəif hesab edilir.**"[16] Amr bin Vaqid çox zəif bir ravidir. İbn Kəsir – rahmətullahi aleyhi – tarix kitabında bu xəbəri qeyd etdikdən sonra

---

[14] "Sunən Əbi Davud", 4888;
[15] "əl-Bidəyə van-Nihəyə", 8/135;
[16] "Sünən ət-Tirmizi", (3843)

deyir: "**Amr bin Vaqid zəifdir. "Ətraf" mövzusunda yazılmış kitabların müəllifləri bunu bu şəkildə Umeyr bin Sad əl-Ənsari'nin müsnədində zikr ediblər. Mənə görə isə bunun Ömər bin əl-Xattab'ın rəvayətindən olması daha münasibdir və doğru variant - "beləliklə də Ömər dedi: "Müaviyəni xeyirdən başqası ilə zikr etməyin" – şəklində olmalıdır ki, onun təyinatına görə Ömər üçün üzr olsun. Bunu gücləndirən budur ki, Hişəm bin Ammar deyib: "İbn Əbis-Səib – və o, Abdulaziz bin əl-Valid bin Süleyman'dır – bizə rəvayət etdi; dedi: Atamı belə deyərkən eşitdim ki, Ömər bin əl-Xattab Müaviyə bin Əbi Sufyan'ın vali təyin etdi və (insanlar etiraz edib) dedilər: "Yaşı az olan birini təyin etdi." Buna görə (Ömər) dedi: "Onu vəli təyin etdiyim üçün məni qınayırsız, halbuki mən Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitmişəm: "Allahım, onu hidayət edici qıl və onunla hidayət et!" Bu, munqati (bir isnad)dır, bundan əvvəlki bunu gücləndirir.**"[17] İbn Kəsir'in zikr etmədiyi daha bir xəbər də vardır. əl-Xalləl "əs-Sünnə" kitabında deyir: "**Yaqub bin Sufyan Əbu Yusuf əl-Fəsəvi bizə xəbər verdi; dedi: Mahmud bin Xalid əl-Əzraq bizə rəvayət etdi; Ömər bin Abdilvahid (əs-Suləmi) bizə rəvayət etdi; dedi: Said bin Abdilaziz bizə Rabia bin Yezid'dən rəvayət etdi ki, "Şam əhlindən bir nümayəndəlik Əmid şəhərində ribatda idilər. Hims şəhərində (vali) Umeyr bin Sad idi. Osman onu çıxarıb yerinə Müaviyəni təyin etdi. Bu xəbər Hims şəhərinə çatdıqda onlara ağır gəldi. Bunun üzərinə Abdurrahmən bin Əbi Umeyra əl-Muzəni dedi: "Allahın elçisini – salləllahu aleyhi va səlləm – Müaviyə üçün belə deyərkən eşitdim: "Allahım onu hidayət edici və hidayət olunmuş elə! Ona hidayət et və onun vasitəsilə hidayət et!**"[18] Bu xəbərin isnadı səhihdir. Ömər bin əl-Xattab'ın Müaviyəni vali təyin etməsi hər şeydən əvvəl onda gördüyü idarəçilik bacarıqlarına və üstün zəkasına görə idi. İbn Cərir ət-Təbəri deyir: "**Abdullah bin Əhməd bin Şəbbuyə mənə rəvayət etdi; dedi: Atam mənə rəvayət etdi; Süleyman (bin Saleh) mənə rəvayət etdi; dedi: Abdullah bin əl-Mubərak mənə İbn Əbi Zib'dən, o da Said əl-Məqburi'dən belə dediyini rəvayət etdi: "Ömər bin əl-Xattab dedi: "Aranızda Müaviyə ola-ola siz Kisra və Qeysar'ın dahiliyindən**

[17] "əl-Bidəyə van-Nihəyə", 11/408-409;
[18] əl-Xalləl, "əs-Sünnə" (697);

**danışırsız!**”[19] Ömərin valiləri arasında Müaviyə uğurlu bir vali kimi seçilirdi və müasirləri bunu etiraf edirdilər. Şam əhlinin Müaviyəyə sevgisi heç cür danıla bilməz. İbn Sad “ət-Tabəqat” kitabında deyir: “**Əhməd bin Muhəmməd bin əl-Valid əl-Əzraqi əl-Məkki və əl-Valid bin Ata bin əl-Əğarr əl-Məkki bizə xəvər verdilər; hər ikisi dedi: Amr bin Yəhya bin Said əl-Uməvi bizə babasından belə dediyini rəvayət etdi: “Müaviyə üzərində yaşıl bir libas ilə Ömər bin əl-Xattab'ın yanına daxil oldu. Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səhabələri ona baxdılar. Ömər bu halı gördükdə əlindəki qamçı ilə dərhal ona tərəf gəldi və Müaviyəni vurmağa başladı. Müaviyə isə deyir: “Allah, Allah! Ey möminlərin əmiri, nə üçün, axı nə üçün?” (Ömər) qayıdıb öz yerinə oturana qədər ona bir cavab vermədi. Bir qrup ona dedi: “Cavan oğlanı nə üçün vurdun, ey möminlərin əmiri, qövmündə onun kimi birisi yoxdur.” Dedi: “Allaha and olsun ki, ondan xeyirdən başqa bir şey görməmişəm və mənə ondan xeyirdən başqa bir xəbər gəlib çatmayıb. Lakin onu - əli ilə (yuxarı) işarə etdi – gördüm, istədim onun üzərindən bunu götürüm.**”[20] Müaviyənin uğurlarının onu qürur və təkəbbürə götürə biləcəyindən narahat olduğu üçün bunu etdiyini Ömər izah edirdi. Burada diqqət edək ki, onun hüzurundakı səhabələr Müaviyə üçün “qövmündə onun kimi birisi yoxdur” dediklərində bununla fəzilətini qəsd edə bilməzdilər, çünki o dövrdə səhabələr arasında ondan da fəzilətli olan səhabələr çox idi. Lakin burada onun Ömərin valiləri arasında ən uğurlu olmasını murad etdikləri görünür. Ömər də - radiyallahu anhu – bunu təsdiqləyir, ondan yalnız xeyir gördüyünü söyləyir.

Həmçinin Müaviyədəki digər üstün cəhətlər də Ömərin bu qərarı verməsinə səbəb ola bilərdi. Bu üstün cəhətləri digər səhabələr görüblər və etiraf ediblər. Əbu Bəkr əl-Xalləl deyir: “**əd-Duri bizə rəvayət etdi; dedi: Nuh bin Yezid əl-Muəddib bizə rəvayət etdi; dedi: İbrahim bin Sad bizə Muhəmməd bin İshaq'dan, o da Nafi'dən, o isə İbn Ömər'dən belə dediyini rəvayət edir: “Allahın elçisindən – salləllahu aleyhi va səlləm – sonra Müaviyədən daha seyid birini görmədim.” Dedim: “O, Əbu Bəkr'dən də seyid idi?” Dedi: “Allaha and olsun ki,**

---

[19] “Tərix ət-Tabəri”, 5/330;
[20] “ət-Tabəqat əl-Kubra – Mutəmmim əs-Səhabə”, (36);

**(Əbu Bəkr) ondan daha xeyirlidir və o, Allaha and olsun ki, Əbu Bəkr'dən daha seyiddir." Dedim: "Ömərdən də daha seyid idi?" Dedi: "Allaha and olsun ki, Ömər ondan daha xeyirli idi və o, Allaha and olsun ki, Ömərdən daha seyid idi." Dedim: "Osmandan da daha seyid idi?" Dedi: "Allaha and olsun ki, Osman şübhəsiz seyid idi, amma o, ondan da seyid idi." əd-Duri dedi: "Əshabımızdan bəziləri dedi: Əhməd bin Hənbəl dedi: "Daha seyid daha səxavətli deməkdir.**" əl-Xalləl bundan sonra eyni rəvayəti Nuh bin Yezid'dən başqa isnadla rəvayət etdikdən sonra axırda deyir: "**(əd-Duri) dedi: "Əhməd bin Muhəmməd bin Hənbəl'dən soruşdum; dedim: "Ey Əbə Abdilləh, seyid sözünün mənası nədir?" Dedi: "Seyid həlim deməkdir, seyid verən deməkdir. Müaviyə Mədinə əhlinə özündən öncəki xəlifələrdən heç birinin vermədiyi qədər hədiyə verib.**"[21] İbn Ömər bu sözlərini Müaviyənin xilafətini gördükdən sonra deyir. Burada belə bir sual vermək yerində olar: Əgər İbn Ömərin nəzərində Müaviyə zalım padişahlardan olubsa onu hansı vicdan ilə dörd xəlifədən də daha seyid biri olaraq vəsf etmək olar? Müaviyə əgər İslam tarixində zülmü ilə, fəsadı ilə damğa vurmuş bir dövlət başçısı idisə camaatın qarşısında onu bu cür səxavətlə, ürəyi açıqlığı ilə, mülayimliyi ilə necə təsvir etmək olar?! Müaviyənin həlim, mülayim bir kimliyə sahib olduğu məşhurdur və ona yoldaşlıq etmiş, onu yaxından tanımış müsəlmanlar bunu şahidlik ediblər. Yaqub əl-Fəsəvi "əl-Mərifə vat-Tərix" kitabında deyir: "**Əbu Bəkr əl-Humeydi bizə rəvayət etdi; Sufyan (bin Uyeynə) bizə rəvayət etdi; dedi: Mucəlid bin Said bizə əş-Şabi'dən belə dediyini rəvayət etdi: Qabisa bin Cəbir'i belə deyərkən eşitdim: "... Müaviyə bin Əbi Sufyana yoldaşlıq etdim, ondan daha mülayim, kobudluğa daha dözümlü və ondan daha səbrli birini görmədim.**"[22] Qabisa bin Cəbir isə kufəli imamlardandır. Ömər bin əl-Xattab, Talha bin Ubeydilləh, Abdurrahmən bin Auf, Abdullah bin Məsud kimi mühacirlərə yoldaşlıq edib. Hətta Abdullah bin əz-Zubeyr mülayimlikdə özünü Müaviyə'yə bənzədərmiş. əl-Xalləl deyir: "**Muhəmməd bin Əli mənə xəbər verdi; dedi: əl-Əsram bizə rəvayət etdi; dedi: Əhməd bin Şəbbuyə bizə Süleyman bin Saleh'dən, o da İbnul-Mubərak'dən, o isə Xalid bin Said bin Amr bin Said'dən belə dediyini rəvayət etdi: Atam dedi:**

[21] əl-Xalləl, "əs-Sunnə", 2/441-442;
[22] "əl-Mərifə vat-Tərix", 1/457-458;

**"İbnuz-Zubeyr həlimlikdə Müaviyəyə özünü bənzədərdi.**" Məhz idarəçilik qabiliyyətinə görə, səxavətinə, mülayimliyinə görə onun dövründə İslam dövlətində əmin-amanlıq möhkəmləndi, insanların rifahı yaxşılaşdı, xeyli islahatlar həyata keçirildi. O dövrə şahidlik edən Aişə anamız o nemətlərin dəyərini gözəl bir şəkildə ifadə edir. Əbu Arubə əl-Hərrani deyir: "**Əbu Musa və Hilal bin Bişr bizə rəvayət etdilər; hər ikisi də dedi: Muhəmməd bin Xalid bin Asmə bizə rəvayət etdi; Süleyman bin Bilal mənə rəvayət etdi; Alqamə bin Əbi Alqamə mənə öz anasından, o da Aişədən belə dediyini xəbər verdi: "Fitnə zamanı insanların vəziyyətindən gördüklərim hələ də yadımdadır, hətta mən təmənni edirəm ki, Allah mənim ömrümdən götürüb Müaviyənin ömrünə artırsın!**"[23] Şübhəsiz ki, bu sözlər Müaviyənin hakimliyindən razı olan birinin sözləridir. Onun hakimiyyətindən razılığını həmçinin digər səhabə Əbu Hureyra da ifadə edib. Əbu Zur'a əd-Diməşqi tarix kitabında deyir: "**Əbu Mushir bizə xəbər verdi; dedi: Sadəqa bin Xalid mənə İbn Cəbir'dən, o da Umeyr bin Həni'dən belə dediyini rəvayət etdi: "Əbu Hureyra deyərdi: "Müaviyə'nin gicgahından möhkəm yapışın! Allahım, məni altmışıncı ilə sağ çatdırma!**"[24] Bu sözlər Əbu Hureyra'dan birdən çox rəvayət yolu ilə sabit olub. Əbul-Abbas əl-Əsam bunu bu cür rəvayət edir: "**Əbu Hureyra Mədinə şəhərinin bazarında gəzərdi və deyərdi: "Allahım, məni altmışıncı ilə sağ yetişdirmə! Yazıqları olsun sizə! Müaviyənin gicgahından möhkəm yapışın! Allahım, məni uşaqların əmirliyinə sağ çatdırma!**"[25] İbn Həcər, əs-Səxavi və başqa alimlərimizin də təsdiqlədiyi kimi Əbu Hureyra bununla Yezidin hakimiyyətini qəsd edirdi, o dövrün zülm və qəsbkarlıq dövrü olduğuna işarə edirdi. Həqiqətən də Yezid altmışıncı ildə hakimiyyətə gəlir və Əbu Hureyra'nın duası qəbul olunur və bundan bir il əvvəl, yəni hicri 59-cu ildə vəfat edir. əl-Beyhəqi "Dəläilun-Nubuvvə" kitabında bu xəbər ilə yanaşı Əli bin Əbi Talib'dən gələn başqa xəbəri də qeyd edərək deyir: "**Amir əş-Şabi dedi: Əli – radiyallahu anhu – Siffin döyüşündən qayıtdıqdan sonra dedi: "Ey insanlar, Müaviyənin əmirliyinə nifrət bəsləməyin! Çünki əgər onu itirsəniz görəcəksiz ki, hanzal bitkisi kimi başlar çiyinlərdən**

[23] "əl-Muntəqa min Kitəbit-Tabəqat li Əbi Arubə əl-Hərrani", səh: 41;
[24] "Tərixu Əbi Zur'a əd-Diməşqi", səh: 231;
[25] "əs-Səni min Hədisi Əbil-Abbas əl-Əsam", (106);

**qopur.**” Bunu və arxasında Əbu Hureyra’nın xəbərini zikr etdikdən sonra əl-Beyhəqi deyir: “**Onların ikisi də belə bir şeyi yalnız peyğəmbərdən – salləllahu aleyhi va səlləm – eşidərək deyiblər.**”[26] Əbu Hureyra’dan gələn rəvayətlərə ümumi nəzər saldıqda görmək olur ki, altmışıncı il ilə bağlı olaraq bildiyi bir hədis olub. Ola bilsin ki, peyğəmbərimiz – aleyhissalətu vassələm – xilafətin otuz il olduğunu xəbər verdiyi kimi, altmışıncı ildən sonra zülmün və şərrin yayğın olacağını da xəbər vermişdir, çünki Əbu Hureyra həqiqi şəkildə o ilə qədər yaşamağını istəməzdi. İbn Sad deyir: “**Muaz bin Həni əl-Bəhrani əl-Basri bizə xəbər verdi; dedi: Hərb bin Şəddəd bizə rəvayət etdi; dedi: Yəhyə bin Əbi Kəsir bizə rəvayət etdi; dedi: Əbu Sələmə bin Abdirrahmən bizə rəvayət etdi ki, o, Əbu Hureyra xəstə olarkən onun yanına daxil oldu və dedi: "Allahım, Əbu Hureyra'ya şəfa ver!" Bunun üzərinə Əbu Hureyra dedi: "Allahım, məni geri qaytarma!” Bunu iki dəfə təkrarladı. Sonra Əbu Hureyra ona dedi: “Ey Əbu Sələmə, ölməyi bacarsan öl! Əbu Hureyra'nın canı əlində olana and olsun ki, alimlərin üzərinə bir zamanın gəlməsinə az qalıb ki, o zamanda ölüm onlardan biri üçün qırmızı qızıldan daha sevimli olacaq.” Yaxud da “insanların üzərinə bir zamanın gəlişinə az qalıb ki, o zamanda bir nəfər bir müsəlmanın qəbrinə gələcək və deyəcək: “Kaş ki, bu qəbrin sahibi mən olardım.**”[27] Həqiqətən də 61-ci ildə Kərbəla faciəsi, 63-cü ildə isə Hərra qətliamı baş verib.

Müaviyə’nin dövlətçilik və siyasət qabiliyyəti tarixçilər tərəfindən sual altına alınmır, həmçinin onun idarə etdiyi dövrdə əmin-amanlığın, güclü idarənin, ümumi ədalətin mövcud olduğu da inkar olunmur. Abdurrazzəq əs-San’ani “əl-Musannəf” kitabında Mə’mər bin Raşid’dən, o da Həmməm bin Munəbbih’dən onun belə dediyini rəvayət edir: “**İbn Abbası belə deyərkən eşitdim: “Müaviyə qədər idarəçiliyə yaraşan başqa birini görmədim.**”[28] Beləliklə də bu səhabələrə görə Müaviyənin idarəçiliyinin özündə heç bir problem yox idi, əksinə onun hakimiyyətindən razı idilər. İbn Asəkir “Tərixu Diməşq” kitabında həsən bir isnad ilə rəvayət edir ki, “**Sad bin Əbi Vaqqas demişdir: “Osmandan sonra bu qapının sahibindən - Müaviyəni qəsd edir – daha haqlı hökm verən birini**

[26] “Dəläilun-Nubuvvə”, 6/466;
[27] “ət-Tabəqat əl-Kubra”, 4/252;
[28] “əl-Musannəf”, 11/453;

**görmədim.**"[29] İbn Sad "ət-Tabəqat əl-Kubra" kitabında deyir: "**Süleyman bin Hərb bizə xəbər verdi; dedi: Həmməd bin Zeyd bizə Əyyub'dan, o da Əbu Qiləbə'dən belə dediyini rəvayət etdi: Kəb (bin Malik) dedi: "Bu ümmətdən heç kim (bundan sonra) Müaviyənin əmirlik etdiyi kimi əmirlik edə bilməyəcək.**"[30] İbn Sad səhih bir isnad ilə rəvayət etdiyi bu xəbərdə Kəb'in atasının adını qeyd etmir, lakin əz-Zəhəbi "Siyər Əaləmin-Nubələ" kitabında bunun ənsarın böyüklərindən Kab bin Məlik olduğunu qeyd edir.[31] İbn Şihəb əz-Zuhri də buna şahidlik edərək deyir: "**Müaviyə illər boyunca Ömər bin əl-Xattab'ın sirası ilə əməl etdi və ondan heç bir şeydə ayrılmadı.**"[32] əz-Zuhri bu sözü ilə Müaviyənin idarəsindəki ədalətdən başqa bir mənanı qəsd etmir. Şübhəsiz ki, Müaviyənin müasirləri olmuş səhabələr və tələbələri Müaviyə haqqında daha doğru qiymət veriblər. Onlar Müaviyənin xətalarını görürdülər, şübhəsiz ki, onu xətalarına görə tənqid edirdilər, amma bu, ona səhabə kimi hörmət göstərməklərinə mane olmurdu. Abdurrazzəq "əl-Musannəf" kitabında deyir: "**Məmər (bin Raşid) bizə əz-Zuhri'dən, o da Humeyd bin Abdirrahmən'dən belə dediyini rəvayət etdi: "əl-Misvar bin Məxramə mənə rəvayət etdi...**". İbn Sad isə "ət-Tabəqat" kitabında deyir: "**Yaqub bin İbrahim bin Sad əz-Zuhri bizə atasından, o da Saleh bin Keysən'dən, o isə İbn Şihəb'dən belə dediyini xəbər verdi: "Urva bin əz-Zubeyr mənə rəvayət etdi ki, əl-Misvar bin Məxramə ona xəbər verib ki, "o, (bir dəfə) nümayəndəlik olaraq möminlərin əmiri Müaviyənin yanına gedib. (Müaviyə) onun ehtiyacını qarşıladıqdan sonra yanına çağırmış və ona soruşmuşdur: "Ey Misvar! İmamlara tən etməyin nə verdi?" əl-Misvar dedi: "Burax bu söhbəti, sənin yanına nə üçün gəlmişiksə o işdə bizə yaxşılıq et!" Müaviyə dedi: "Sən özün şəxsən məni nədə ayıbladığını deməyənə qədər buraxan deyiləm." əl-Misvar dedi: "Onu qınadığım heç bir şeyi qoymadan hamısını ona bəyan etdim."**

---

[29] "Tərixu Diməşq", 59/161;

[30] "ət-Tabəqat əl-Kubra – Mutəmmim əs-Sahabə" (43);

[31] Lakin əz-Zəhəbi'nin "Tərixul-İsləm" kitabında Kəb bin Malik yox, Kəb əl-Əhbər olaraq keçir. Bunun xəta olduğu aşkardır, çünki Kəb əl-Əhbər - əz-Zəhəbi'nin özünün də qeyd etdiyi kimi – Osmanın xilafətinin sonlarında vəfat edib, Müaviyənin xilafəti dövrünü görməyib. Lakin Kəb bin Malik hicri 50-ci ildə - bir başqa rəyə görə isə 53-cü ildə - vəfat edib, yəni Müaviyənin əmirliyini ən azından 9 il görüb. Burada Kəb'in bir başqa səhabə Kəb bin Ucra da olması mümkündür, çünki Əbu Qiləbə ondan rəvayəti ilə tanınır. O, hicri 52-ci ildə vəfat edib.

[32] Əbu Bəkr İbn əl-Xalləl, "əs-Sunnə" (683); İsnadı səhihdir.

**Müaviyə dedi: “Günahlardan özümü təmizə çıxarmıram. Bəs sən bizim insanlar arasında həyata keçirdiyimiz islah işlərindən bir şeyi bizim leyhimizə hesaba almırsanmı? Halbuki bir yaxşılıq on misli ilə ölçülür. Yoxsa sən günahları sayıb, yaxşılıqları tərk edənlərdənsən?” əl-Misvar dedi: “Yox, Allaha and olsun ki, gördüyümüz bu günahlardan başqa bir şeyi zikr etmirik.” Müaviyə dedi: “Biz əlbəttə ki, etdiyimiz bütün günahları etiraf edirik. Bəs sənin, ey Misvar, özünün bildiyin elə günahların yoxdurmu ki, Allahın onları sənin üçün bağışlamadığı təqdirdə onların səni həlak edəcəyindən qorxasan?” əl-Misvar dedi: “Bəli, (var).” Bəs o zaman bağışlanmağa ümidli olmağa səni məndən daha layiqli edən nədir?! Allaha and olsun ki, sənin etdiklərindən daha çox islah işini mən edirəm və mən – Allaha and olsun ki, - Allah ilə başqası arasında seçimlə qarşılaşdıqda Allahı seçirəm. Mən elə bir dinə etiqad edirəm ki, o dində əməl qəbul olunur, ona görə həsənətlə mükafatlandırılır və günahlara görə cəza vardır, amma Allah istəsə bağışlayar. Mən etdiyim hər xeyir işə görə qat-qat çox əcr qazanmağa ümidliyəm və saya bilməyəcəyim qədər böyük işlər yerinə yetirirəm; müsəlmanlar üçün namazlarını iqamə edirəm, Allah uğrunda cihad edirəm, Allahın endirdikləri ilə hökm edirəm, saysam da sayıb bitirə bilməyəcəyim işlər görürəm. Bunların üzərində bir fikirləş!” əl-Misvar dedi: “Bildim ki, bu dediklərini zikr etdikdə Müaviyə məni susdurdu.” Urva dedi: “Ondan sonra əl-Misvarı hər dəfə Müaviyə’nin adını çəkərkən ona xeyir-dua etdiyini eşitdim.**”[33] əl-Misvar bin Məxramə - radiyallahu anhu – səhabədir və Abdurrahmən bin Auf’un bacısı oğludur. Hakimlərə qarşı şiddətli olub, onları dili ilə inkar edərdi. əl-Misvar bununla məşhur idi, hətta buna görə xavaric qruplar onu özlərindən hesab edir, onu təzim edirdilər.[34] Haqq sözü deyən biri idi və Müaviyə ilə Əli’nin arasındakı müharibədə Əli bin Əbi Talib’in – kərraməllahu vachəhu – yanında yer almışdı. Daha sonra Abdullah bin əz-Zubeyr’in yanında yer alır və Yezidin hakimiyyətini rədd edir. Məhz Məkkənin mühasirəsində mancanaqdan atılmış daşla yaralanır və vəfat edir. Təbii ki, əl-Misvar dövründə olub bitənləri bizdən də yaxşı bilirdi, Müaviyənin də şəxsini gözəl tanıyırdı. Onun eyiblərini,

---

[33] “əl-Musannəf”, 11/344; “ət-Tabəqat əl-Kubra – Mutəmmim əs-Sahabə” (48);

[34] “Tərixu Diməşq”, 58/161;

qüsurlarını bilməsi onun üçün xeyir-dua etməsinə mane olmurdu. Abdullah bin əz-Zubeyr özü Müaviyə'nin fəzilətini etiraf edirdi. Əbul-Fərac əl-Əsfəhəni "əl-Əğani" kitabında deyir: "**əl-Hərami bin Əbil-Alə mənə xəbər verdi; dedi: əz-Zubeyr bin Bəkkər mənə rəvayət etdi; dedi: əmim mənə babamdan, o da Hişəm bin Urva'dan, o isə atasından belə dediyini rəvayət etdi: "Abdullah bin əz-Zubeyr bir gün bizə namaz qıldırdı, sonra namazdan çıxdı və içində hıçqırtı ilə ağlamağa başladı; ona Müaviyənin ölüm xəbərini çatdırmışdılar. Sonra dedi: "Allah Müaviyəyə rəhm etsin! Onu aldatdığımızda bizə qəsdən aldanardı və heç kim ondan daha səxavətli deyildi. Ondan qorxduğumuzda bizə qorxmuş kimi özünü göstərərdi, halbuki qəzəbli aslan ondan cürətli deyildi. Allaha and olsun ki, Bəthə əl-Uzri'nin dediyi kimi idi: "Minbərlərə çıxıb ora dikilən hər şey barəsində çəkinmədən danışır. Xütbəsini uzadıb sözünü itirdikdə sözlərin ən gözəli ona qayıdır." Allaha and olsun ki, Umeymə bint Ruqeyqa'nın dediyi kimi idi: "Niyə də onun üçün ağlamayım? Niyə də onun üçün ağlamayım? Bilin ki, bütün fütuvvət onda idi." Allaha and olsun ki, Əbu Qubeys dağı qaldığı müddətdə onun qalmasını istərdik; əqli onu aldatmaz, qüvvətində naqislik olmazdı." (Urva) dedi: "Bildik ki, adam ayrılıqdan üzülüb".**"[35] Əbu Abdilləh Muhəmməd bin İshaq əl-Fəkihi bu xəbəri belə rəvayət edir: "**Əbu Osman Muhəmməd bin Yaqub əş-Şafi mənə rəvayət etdi; dedi: Musab əz-Zubeyri mənə rəvayət etdi; dedi: atam mənə Hişəm bin Urva'dan, o da atasından belə dediyini rəvayət etdi...**"[36] Musab əz-Zubeyri isə Musab bin Abdilləh bin Musab bin Səbit'dir, nəsəb alimidir, hədisdə siqadır və məşhur tarixçi alim əz-Zubeyr bin Bəkkər'in əmisidir. Gördüyümüz kimi bu xəbəri bizə Musab bin Abdilləh əz-Zubeyri atası Abdullah bin Musab bin Sabit əz-Zubeyri'dən, o da Hişəm bin Urva'dan, o isə Urva bin əz-Zubeyr'dən, yəni Abdullah bin əz-Zubeyr'in kiçik qardaşından rəvayət edir. Tarixçi alim Əhməd bin Yəhya əl-Bələzuri "Ənsəbul-Əşraf" kitabında bu xəbəri Əbul-Həsən Əli bin Muhəmməd əl-Mədəini'dən, o da Əbu Abdirrahmən bin İsmail'dən, o isə Hişəm bin Urva'dan rəvayət edir. İbn Əbid-Dunyə bunu əl-Mufəddal bin Ğassən'dən, o da Əli bin Saleh'dən, o da Amir bin Saleh'dən, o isə Hişəm bin Urva'dan

[35] "Kitəb əl-Əğani", 19/212-213;
[36] "Əxbəru Məkkə", 3/63;

rəvayət edir. İbn Asəkir bu xəbəri bir neçə isnad ilə tarix kitabında qeyd edir. Sabit olmuş bu rəvayətin əsasında biz mübarək bir səhabənin Müaviyənin ölümünə üzüldüyünə şahid oluruq. Bu təbii ki, bizdə belə bir sual doğurur: əgər Müaviyə bir əmir kimi zalım olsaydı, bir insan kimi fasiq olsaydı səhabə hansı üzr ilə onun ölümünə üzülürdü?! Həmçinin Əhməd bin Yəhya əl-Bəlazuri deyir: **"əl-Mədəini'dən, o isə Avanə'dən, o da atasından rəvayət edir ki, İbn Abbas demişdir: "İbn Hind'in xeyri Allahdandır. Bizə iyirmi il əmirlik etdi; öz irzini və bizim irzimizi qorumaq məqsədi ilə nə minbərin, nə də səccadənin üzərində bizə əziyyət etmədi. Bizimlə gözəl münasibət saxlayırdı və ehtiyaclarımızı qarşılayırdı.**"[37]

Üstəlik əlavə etməliyik ki, səhabələr Müaviyədən peyğəmbərin – aleyhissalətu vassələm – hədislərini rəvayət ediblər. Bəzi araşdırmaçılar ondan hədis rəvayət etmiş səhabələrin sayının iyirmi üç olduğunu deyiblər. Müaviyəni əgər zalım, fasiq biri hesab etsəydilər peyğəmbərin – aleyhissələm – sözünü rəvayət etməkdə ona etibar etməzdilər. Bu faktı əhəmiyyətsizləşdirmək cəhdləri isə əbəsdir. Əgər Müaviyə həqiqətən də dinində, əxlaqında etibar olunmayan bir şəxs olubsa səhabələrin ona peyğəmbərin sözünü qəbul etməkdə etibar etməklərinin nə məntiqi, nə də dini bir izahı yoxdur. Müaviyə'dən hədis rəvayət etmiş tabii imamların sayı isə qat-qat çoxdur. Bu fakt bizə Müaviyənin ən azından rəvayətdə adil qəbul edildiyini göstərir. Bunun sübutunu biz İmam Əhməd'in səhih sənədlə müsnədində rəvayət etdiyi xəbərdə görürük. Əhməd deyir: "**Əbu Amr Mərvan bin Şucə əl-Cəzəri bizə rəvayət etdi; Xuseyf bizə Mücahid'dən, o da Ata'dan, o isə İbn Abbas'dan rəvayət edir ki, Müaviyə ona xəbər verdi ki, "o, Allahın elçisini – salləllahu aleyhi va sələm – saçını oxun ucu ilə qısaltdığını gördü." Biz İbn Abbasa dedik: "Bu xəbər bizə Müaviyədən başqa heç kimdən gəlib çatmayıb." Buna görə (İbn Abbas) dedi: "Müaviyə Allahın elçisindən – salləllahu aleyhi va sələm – (rəvayətində) ittiham olunmurdu.**"[38] Özümüzə belə bir sual verməliyik ki, Müaviyə fasiqliyi ilə tanınırdısa onu necə Allahın elçisindən – aleyhissələm – rəvayət etdiklərində ittiham

[37] "Ənsəbul-Əşraf", 5/83 (272); Avanə'nin atası əl-Hakəm bin Avanə bin İyad məchuldur.
[38] "Musnəd Əhməd", 28/77;

etmirdilər?! Din kimi ən ağır bir əmanətdə fasiqlərə etibar etmək olmaz. Bu düşüncə bizi yalnız bir nəticə ilə qarşı-qarşıya qoyur.

Səhabələrin Müaviyəyə olan münasibəti ilə tanış olduq və demək olar ki, burada ən əsas rol məhz səhabələrin münasibəti olmalıdır. Əgər səhabələr Müaviyəyə rəhmət oxuyubsa, onu tərifləyibsə, ona bir səhabə kimi sevgi və hörmət bəsləyiblərsə, xətaları üçün Allahdan bağışlanma diləyiblərsə bizə düşən də eyni şey olmalıdır. Səhabələrin münasibəti onlardan sonra gələn nəsillərdə də öz əksini tapıb və ümmətin ən tanınmış şəxsiyyətləri Müaviyəni səhabə kimi sayıb seviblər. İbn Asəkir tarix kitabında səhih isnadla rəvayət edir: "**Əbul-Əşhəb deyir: "əl-Həsən (əl-Basri)yə dedilər: "Ey Əbu Said, burada bir qrup insan var ki, Müaviyəni və İbnuz-Zubeyri söyürlər və ya lənətləyirlər." Dedi: "Bu lənət edənlərə Allahın lənəti olsun!**"[39] İbn Kəsir tarixində deyir: "**İbn Vəhb Malik'dən, o da əz-Zuhri'dən belə dediyini rəvayət edir: "Said bin əl-Museyyəb'dən Allah elçisinin – salləllahu aleyhi va səlləm – səhabələri haqqında soruşdum və mənə dedi: "Dinlə ey Zuhri! Kim Əbu Bəkri, Öməri, Osmanı və Əlini sevərək, on səhabəyə cənnətlə şahidlik edərək və Müaviyəyə rəhmət oxuyaraq ölərsə hesabda onu münaqişə etməmək Allah üzərində haqq olar.**"[40] Əbul-Fədl Saleh bin Əhməd atası Əhməd bin Hənbəl'dən, o da Əbul-Muğira'dan, o da İsmail bin Ayyəş'dən, o isə Şurahbil bin Muslim'dən tabiinin seyidi, əsrinin zahidi Əbu Muslim Abdullah bin Səvb əl-Xavləni'nin – rahmətullahi aleyhi - Müaviyəyə dediyi bu sözlərini rəvayət edir: "**Allaha and olsun ki, səni sevdiyimizdən bəri sənə nifrət etməmişik, sənə itaət etdiyimizdən bəri asilik etməmişik, səninlə bir araya gəldiyimizdən bəri səndən ayrılmamışıq, sənə beyət etdiyimizdən bəri beyətimizi pozmamışıq. Qılınclarımız çiyinlərimizdədir; bizə əmr etsən itaət edəcəyik, çağırsan cavab verəcəyik, bizi qabaqlasan sənə çatacağıq, biz səni qabaqlasaq səni gözləyəcəyik.**"[41] Səhih sənədlə gəlmiş bu xəbərdə tabiin nəslinin böyük imamlarından biri sayılan Əbu Muslim əl-Xavləni'nin Müaviyəni sevdiyinə şahidlik etdiyini görürük. Həmçinin Mücahid bin Cəbr deyir:

---

[39] "Tərixu Dəməşq", 59/206;
[40] "əl-Bidəyə van-Nihəyə", 11/449;
[41] "Məsəil əl-İmam Əhməd", 2/328-330;

“**Siz əgər Müaviyəni görsəydiniz deyərdiz ki, bu, Mehdidir.**”[42] Bunu Mücahid’dən rəvayət edən tələbəsi əl-Aməş’dir. Əbu Bəkr İbnul-Xalləl bu xəbəri ondan Muhəmməd bin Süleyman bin Hişəm – Əbu Muaviyə əd-Darir - əl-Aməş isnadı ilə rəvayət edir, lakin Muhəmməd bin Süleyman şiddətlə tənqid olunub. Amma əl-Acurri bunu Abdullah bin Nəciyə - Hüseyn bin Əli bin əl-Əsvad əl-İcli – Abdullah bin Numeyr - əl-Aməş isnadı ilə rəvayət edir və bu isnadda əl-Hüseyn bin Əli əl-İcli üzərində ixtilaf edilib, çünki bəziləri onu zəif saysalar da digərləri siqa hesab ediblər və əl-Hafiz İbn Həcər onun xəta edən saduq bir ravi olduğunu deyir. ət-Tabərani isə deyir: “**əl-Hüseyn bin İshaq (ət-Tustəri) bizə rəvayət etdi; Yusuf bin Muhəmməd bin Sabiq bizə rəvayət etdi; Əbu Yəhya əl-Himməni’ni belə deyərkən eşitdim: əl-Aməş’i belə deyərkən eşitdim: “Müaviyəni görsəydiniz deyərdiz ki, bu, Mehdidir.**”[43] Yusuf bin Muhəmməd’i yalnız İbn Hibban əl-Busti siqa ravilər arasında qeyd edib. əl-Aməş’in bu sözünü həmçinin tabiin təbəqəsinin imamlarından Əbu İshaq əs-Səbii’dən də rəvayət ediblər. əl-Aməş’in Müaviyə ilə bağlı mövqeyini bizə İbnul-Xalləl “əs-Sünnə” kitabında bildirir. O deyir: “**Muhəmməd bin Əli bizə xəbər verdi; Əbu Bəkr əl-Əsram bizə rəvayət etdi; dedi: Əhməd bin Cəvvas Əbu Asim əl-Hənəfi bizə rəvayət etdi; dedi: Əbu Hureyra əl-Muktib Hubəb bizə rəvayət etdi; dedi: “əl-Aməş’in yanında idik. Ömər bin Abdilaziz’i və onun ədalətini zikr etdilər. Bunun üzərinə əl-Aməş dedi: “Müaviyənin zamanına yetişsəydiniz nə deyərdiz?! Dedilər: “Ey Əbu Muhəmməd, həlimliyini qəsd edirsən?” Dedi: “Xeyr, Allaha and olsun. Əksinə ədalətini qəsd edirəm.”**[44] Bu xəbər Əbu Hureyra əl-Muktibdən sabitdir. Görünür ki, həqiqətən də ilk dövrün alimləri Müaviyəni adil bir xəlifə kimi tanıyıblar. Əbu Təvbə ər-Rabi bin Nəfi əl-Hələbi deyir: “**Müaviyə peyğəmbərin – salləllahu aleyhi va sələm – səhabələri üçün bir örtüdür; kimsə əgər örtünü açarsa onun arxasındakına qarşı cürətli olar.**”[45] Əbu Bəkr İbnul-Xalləl “əs-Sünnə” kitabında deyir: “**Əbu Bəkr əl-Mərvazi mənə xəbər verdi; Əli bin Xaşram bizə yazdı; dedi: Bişr bin əl-Haris’i belə deyərkən eşitdim: “əl-Muafi’dən soruşdular və mən dinləyirdim və ya mən ondan**

---

[42] əl-Xalləl, “əs-Sunnə”, 2/438 (669); əl-Acurri, “əş-Şəriah”, 5/2465 (1953);
[43] “əl-Mucəm əl-Kəbir”, 19/308 (691);
[44] əl-Xalləl, ”əs-Sunnə”, 2/437 (667);
[45] “Tərixu Dəməşq”, 59/209;

**soruşdum: “Müaviyə yoxsa Ömər bin Abdilaziz daha fəzilətlidir?” Dedi: “Müaviyə altı yüz Ömər bin Abdilaziz’dən daha fəzilətli idi.**”[46] İmam Əbu Bəkr Muhəmməd bin əl-Huseyn əl-Acurri deyir: “**Cəfər bin Abdilləh bin Yaqub bizə xəbər verdi; dedi: Muhəmməd bin Harun ər-Ruyəni bizə xəbər verdi; dedi: Əbu Kureyb bizə xəbər verdi; dedi: İbnul-Mubərak bizə Muhəmməd bin Muslim’dən, o da İbrahim bin Meysərə’dən belə dediyini rəvayət etdi: “Ömər bin Abdilazizi bir insanı vurarkən görmədim, yalnız Müaviyəni söyən bir nəfər istisna idi, onu bir neçə şallaq vurdu.**”[47] Səhih sənədlə rəvayət edilmiş bu xəbəri eyni isnadla İbn Asəkir “Tərixu Diməşq” kitabında rəvayət edir. Həmçinin Abdullah bin əl-Mubərak, Malik bin Ənəs, Əhməd bin Hənbəl, Əbu Zura ər-Razi və digər böyük İslam alimləri Müaviyənin səhabə kimi hörmətini və sevgisini saxlayıblar.

Nə üçün Müaviyə bu sevgiyə və hörmətə layiq idi? Bunun birdən çox cavabı vardır. Hər şeydən öncə Müaviyə Allahın – cəllə cələluhu – bu sözlərinə daxildir: “**Sonra da Allah Öz peyğəmbərinə və möminlərə arxayınlıq nazil etdi, görmədiyiniz əsgərlər endirdi və kafirləri əzaba düçar etdi. Bu, kafirlərin cəzasıdır.**” (ət-Təvbə, 26) Bu ayədə qəsd olunan möminlər Huneyn döyüşündə iştirak etmiş səhabələrdir və Müaviyə onlardan biri idi. Həmçinin Allah – azzə va cəllə - deyir: “**Sizdən fəthdən əvvəl sərf edənlər və vuruşanlar (başqaları ilə) eyni deyildir. Onlar fəthdən sonra sərf edib döyüşənlərdən dərəcə etibarı ilə üstündürlər. Bununla belə Allah onların hamısına ən gözəl olanı vəd edib. Allah sizin nə etdiklərinizdən xəbərdardır.**” (əl-Hədid, 10) Allahın verdiyi bu vədin altına Müaviyə də daxil olur, çünki o da Huneyn və Taif döyüşlərində iştirak etmiş, bu döyüşlər üçün mal sərf etmişdir. Həmçinin peyğəmbərimiz – salləllahu aleyhi va sələm – onun üçün dua etmiş və demişdir: “**Allahım, onu hidayət edən və hidayət olunmuş et və onunla hidayət et!**”[48] Bir başqa hədisdə onun üçün belə dua edib: “**Allahım, Müaviyəyə yazmağı və hesabı öyrət və onu əzabdan qoru!**”[49] Yuxarıda da izah etdiyimiz səbəblərə əsasən Müaviyə peyğəmbərə - aleyhissalətu vassələm – yoldaşlıq etmiş səhabə sinfinə

---

[46] “əs-Sunnə”, 2/435 (664);
[47] “Şərh Usuli İtiqadi Əhlis-Sunnə val-Cəməah”, 7/1341 (2385);
[48] “Musnəd Əhməd”, 29/426; “Sunən ət-Tirmizi” (3842)
[49] “Fədailus-Sahəbə” (1748); “Sahih İbn Xuzeymə” (1938); “Şərh Məanil-Əsər”, 1/446;

daxil idi və bu, digər səhabələr tərəfindən sayılaraq qəbul edilirdi. Üstəlik adil xəlifə Ömər bin əl-Xattab onu Şam əyaləti üzərində vali təyin etmişdi. Bu, kiçik və əhəmiyyətsiz bir göstərici deyildir, çünki Ömərin minbər başında dediyi bu sözlər məşhurdur: "**Allahım, mən Səni əyalətlər üzərindəki əmirlər barəsində şahid tuturam! Mən onları onların üzərinə yalnız ona görə (əmir olaraq) göndərdim ki, onları ədalətlə idarə etsinlər, insanlara dinlərini və peyğəmbərlərinin – salləllahu aleyhi va səlləm – sünnətini öyrətsinlər, onların arasında qəniməti bölsünlər və sonra onlara problemli qalan məsələləri mənə yönləndirsinlər.**"[50] Ömərin də sözündən anladığımız kimi o, əmirlərini sadəcə rəiyyətlə ədalətli davranmağa görə yox, həm də onlara dinlərini öyrətmək üçün göndərərdi. Bu onu göstərir ki, Ömər – radiyallahu anhu – Müaviyəni bu vəzifəni yerinə yetirə biləcək bir şəxs kimi görürdü. Üstəlik nəzərə almaq lazımdır ki, Şam əyaləti adi bir bölgə deyildi, bir cəbhə zonası idi və bizanslılarla daim müharibə şəraitində yaşayan bir coğrafiya idi. Tarixən çoxlu mədəniyyətlərə şahidlik etmiş, millətlərin tarixən qarışdığı bir əyalətə əmirlik etmək heç bir zaman asan bir iş olmayıb, lakin Müaviyə bunun öhdəsindən çox məharətlə gəlirdi. Həmçinin nəzərə almaq lazımdır ki, vali nə qədər adil olsa da rəiyyətin narazılığı onu vəzifəsindən azad etmək üçün Ömərə kifayət edirdi. Ona görə də Kufə əhli yalandan şikayət etdikdə oranın valisi Sad bin Əbil-Vaqqası vali vəzifəsindən alır. Halbuki Sad ən xeyirli, ən fəzilətli səhabələrdəndir.

[50] "Sahih Muslim" (567);

## MÜAVİYƏNİN ÖZƏLLİKLƏRİ

Müaviyə bin Əbi Sufyan həm vali olduğu dövrdə, həm də müsəlmanlara xəlifə olduğu dövrdə bir çox müsbət özəllikləri ilə tanınıb. Bəlkə də onun ən tanınmış özəlliyi xasiyyətindəki mülayimliyi olub və o, insanları kobudluqlarına baxmayaraq əfv edərdi. Daha öncə Abdullah bin əz-Zubeyr'in mülayimlikdə özünü Müaviyəyə oxşatdığını nəql etmişdik. əl-Bələzuri, İbn Asəkir və başqalarının sənədləri ilə rəvayət etdiklərinə əsasən Müaviyə xəlifə ikən Əbu Cəhm ibn Huzeyfə onun yanına daxil olur və onu alçaldan tərzdə sözlər işlədir. Müaviyə bir müddət başını aşağı salır, sonra başını qaldıraraq deyir: "**Ey Əbu Cəhm! (Məndən sonra) sultandan ehtiyatlı ol, çünki o, uşaq kimi qəzəblənir, aslan kimi cəzalandırır.**" Sonra ona hədiyyə verərək yola salır.[51]

Bizə gəlib çatmış xəbərlərdən görə bilirik ki, o, haqq sözə itaət etmiş və əhdə sadiq qalmağa əhəmiyyət vermişdir. İbn Zəncəveyh "əl-Əmval" kitabında deyir: "**Bişr bin Ömər bizə xəbər verdi; Şubə bizə xəbər verdi; Əbul-Feyd mənə xəbər verdi; dedi: Suleym bin Amir'i belə deyərkən eşitdim: "Müaviyə bizanslılar ilə sülh bağladı, əhdin müddəti bitmədən öncə onların ərazisində seyr etməyə başladı. Bir də gördü ki, at üstündə bir nəfər deyir: "Allahu Əkbər! Vəfalı ol, aldatma!" Müaviyə dedi: "Bu kimdir?" Dedilər: "Amr bin Abəsə'dir." (Müaviyə) bunun üzərinə ondan soruşdu: "Nə demək istəyirsən?" Dedi: "Mən Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Kimin bir qövm ilə arasında əhd varsa müddəti bitənə qədər (əhdin) düyünü nə açılmalı, nə də möhkəmlənməlidir ya da bərabət şərtlərdə (əhdin pozulduğu) onlara bildirilməlidir." Bundan sonra Müaviyə qayıtdı.**"[52] Bu xəbəri bir çox hədis kitablarından bir-birindən fərqli sözlər ilə oxumaq mümkündür. Xəbərin hamısı

---

[51] "əl-Mucələsə va Cəvahirul-İlm", 4/408 (1603); "Tərixu Dəməşq", 59/162;

[52] "əl-Əmval", 1/401 (660);

Müaviyə'nin peyğəmbərdən – aleyhissalətu vassələm – eşitdiyi sözə tabe olub hərbi yürüşündən geri döndüyünü xəbər verir. Nəzərə almaq lazımdır ki, hərbi yürüşə çıxmaq uzun hazırlıqları tələb edən bir işdir, buna baxmayaraq peyğəmbərin – aleyhissalətu vassələm – sözünü çeynəyənlərdən olmaq istəməyərək hərbi planından geriyə çəkilməli olmuşdur.

İmam Əhməd deyir: "**İsmail bin İbrahim bizə Əli bin əl-Həkəm'dən belə dediyini rəvayət etdi; Əbul-Həsən mənə rəvayət etdi ki, Amr bin Murra (bir gün) Müaviyəyə dedi: "Ey Müaviyə, mən Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Qapısını ehtiyac, fəqirlik və miskinlik sahiblərinin üzünə bağlayan elə bir imam və ya vali yoxdur ki, Allah səmanın qapılarını onun ehtiyacı, fəqirliyi və miskinliyi qarşısında bağlamasın!" Dedi: "Bunun üzərinə Müaviyə insanların ehtiyaclarına baxmaq üçün bir nəfər təyin etdi.**"[53] İbn Həcər və əz-Zəhəbi bu rəvayətin səhih olduğunu deyiblər. Burada Müaviyə'nin yenə hədisin təhdidindən təsirləndiyini görmək olur. Daha əvvəl Əhməd bin Hənbəl'in sözləri keçdi. Orada Müaviyə'nin Mədinə əhlinə verdiyi mal-dövlətin çoxluğunu qeyd edirdi. İbn Zəncəveyh deyir: "**Osman bin Saleh bizə İbn Ləhiah'dən, o da Əbu Qabil'dən belə dediyini rəvayət etdi: "(Uşaq ikən) Müaviyə bin Əbi Sufyan'ın zamanında yağ və bal ilə ruzilənirdik, qadınlarımız isə vars və zəfəran ilə ruzilənirdilər.**"[54] Bu kimi xəbərlər onun idarəsi altında ictimai rifahın yaxşılaşdığını göstərir və Müaviyə'nin bir əmir, bir dövlət başçısı kimi xalqına xidmət etdiyini isbat edir.

Müaviyə'nin xilafəti dövründə Allahın – cəllə cələluhu - Kitabına və peyğəmbərin – salləllahu aleyhi va səlləm – sünnətinə riayət etməyə çalışdığını da görə bilirik. Əhməd bin Hənbəl'in "əl-Musnəd" kitabında səhih bir isnad ilə rəvayət etdiyi xəbərdə deyilir: "**əl-Abbas bin Abdillah bin Abbas öz qızını Abdurrahmən bin əl-Həkəmə ərə verdi və Abdurrahmən də öz qızını ona ərə verdi və onlar (bu razılaşmanın özünü) mehr hesab etdilər. Bunun üzərinə Müaviyə bin Əbi Sufyan – o vaxt xəlifə idi – Mərvan'a yazaraq onların evliliklərini ayırmağını əmr etdi. Yazısında deyirdi: "Bu, Allahın elçisinin – salləllahu aleyhi**

---

[53] "Musnəd Əhməd", 29/565;
[54] "əl-Əmval", 2/561;

**va səlləm – qadağan etdiyi "sığar" evliliyidir.**"[55] Bu, onun xəlifə kimi cəmiyyətin fərqli sahəbələrində sünnəti tətbiq etdiyini göstərir. Hətta bunu öz şəxsi həyatında da izlədiyini deyə bilərik. İbn Əbi Şeybə "əl-Musannəf" kitabında Əbu Usəmə - Həbib bin Şəhid – Əbu Micləz kanalı ilə rəvayət edir ki, "**Müaviyə içində Abdullah bin Amir və Abdullah bin əz-Zubeyr'in olduğu bir evə daxil oldu. Buna görə Abdullah bin Amir ayağa qalxdı, amma Abdullah bin əz-Zubeyr qalxmadı. Müaviyə buna görə İbn Amir'ə dedi: "Otur, çünki mən Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Kim insanların onun üçün ayağa qalxmasına sevinərsə atəşdə yerini hazırlasın!**"[56]

Müaviyənin peyğəmbərin – salləllahu aleyhi va səlləm – sünnətinə böyük əhəmiyyət verdiyini göstərən bir çox xəbər vardır. Misal üçün İmam Əhməd "əl-Müsnəd" kitabında deyir: "**Həşim bin əl-Qasim bizə rəvayət etdi; İshaq bin Said bin Amr bin Said bin əl-As bizə Said'dən, yəni atasından belə dediyini rəvayət etdi: "Müaviyə ümrə etdi və Kəbəyə daxil oldu. İbn Ömərin arxasında adam göndərdi və oturub orada gözlədi. (İbn Ömər gəldikdə) dedi: "Kəbəyə daxil olduğu gün Allahın elçisi – salləllahu aleyhi va səlləm – harada namaz qıldı?" Dedi: "Onunla bir yerdə deyildim, lakin o çıxmaq istədikdə mən daxil oldum və Bilal ilə qarşılaşdım. Ondan soruşdum: "Harada namaz qıldı?" Mənə xəbər verdi ki, bu iki dirəyin arasında qıldı. Bunun üzərinə Müaviyə qalxdı və o ikisi arasında namaz qıldı.**"[57] Həmçinin əl-Buxari "əs-Sahih" kitabında rəvayət edir ki, "**Müaviyə - radiyallahu anhu – dedi: "Siz elə bir namaz qılırsız ki, biz peyğəmbərə - salləllahu aleyhi va səlləm – yoldaşlıq etdik, amma onu elə namaz qılarkən görmədik. O iki rükəti qadağan etdi." Əsrdən sonrakı iki rükəti qəsd edirdi.**"[58] Yuxarıda onun namazında sünnətə tabe olması ilə bağlı Əbud-Dərdə'nin şahidliyini təqdim etmişdik.

Müaviyə səxavəti ilə yanaşı sədəqəyə təşviq edənlərdən biri idi. Yunus bin Meysərə bin Həlbəs deyir: "**Müaviyə bin Əbi Sufyan'ı eşitdim ki, xütbə verərkən dedi: "... Namazda üzlərinizi və sıralarınızı düz tutun və sədəqə verin! Qoy heç kim "mənim malım azdır" deməsin, çünki**

[55] "Musnəd Əhməd", 28/70;
[56] "əl-Musannəf", 5/234 (25582);
[57] "Musnəd Əhməd", 39/334 (ər-Risələ);
[58] "Sahih əl-Buxari", (587, 3766);

**malı az olanın verdiyi sədəqə zənginin verdiyi sədəqədən daha fəzilətlidir. İffətli qadınları da ittiham etməyin! Sizdən heç kim "eşitdim" və ya "mənə çatdı" deməsin! Çünki Allaha and olsun ki, o sözlər Nuhun əhdində deyilmiş olsa belə buna görə cəzalandırılacaq. Xeyri öz nəfslərinizə adət edin! Çünki Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Xeyir adətdir, şər isə inadkarlıqdır. Allah kimə xeyir diləyərsə onu dində fəqih edər!**"[59] Yunus ibn Həlbəs'dən bu xütbəni Mərvan bin Cunəh, Amr bin Vaqid və Xalid bin Yezid rəvayət edirlər və bu, ondan sabitdir.

Onun Allahdan qorxduğuna, Axirətə iman etdiyinə və peyğəmbərin – aleyhissalətu vassələm – hədislərindən təsirləndiyini də görmək mümkündür. ət-Tirmizi'nin, İbn Hibban'ın və başqalarının səhih isnadla rəvayət etdikləri hədisdə əl-Valid bin Əbil-Valid Əbu Osman əl-Mədəni deyir ki, "**Uqbə bin Muslim ona rəvayət edib ki, Şufey əl-Əsbəhi ona rəvayət edib ki, o, (bir dəfə) Mədinəyə daxil olduqda insanların ətrafına toplandıqları bir nəfər ilə qarşılaşıb və soruşub: "Bu kimdir?" Deyiblər: "Əbu Hureyra'dır." Ona yaxınlaşdım və qarşısında oturdum və o, bu zaman insanlara hədis danışırdı. Susduqda və tək qaldıqda ona dedim: "Səni and verirəm ki, mənə Allahın elçisindən – salləllahu aleyhi va səlləm – eşitdiyin, yaxşı anladığın və əzbərlədiyin bir hədis rəvayət edəsən!" Əbu Hureyra dedi: "Edərəm. And olsun ki, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – mənə danışdığı yaxşı dərk etdiyim və əzbərlədiyim bir hədisi sənə rəvayət edəcəm. Sonra az qala huşunu itirəcək dərəcədə halı pisləşdi, bir az gözlədik və özünə gəldi. Dedi: "Allahın elçisinin – salləllahu aleyhi va səlləm – bu evdə onunla məndən başqasının olmadığı halda mənə danışdığı bir hədisi sizə rəvayət edəcəm." Sonra Əbu Hureyra'nın halı şiddətli bir şəkildə pisləşdi, sonra özünə gəldi və üzünü sildi....**" Əbu Hureyra'nın rəvayət etdiyi bu hədisdə Allahın Qiyamət günü üç nəfəri sınağa çəkməyindən bəhs edilir və bu üç nəfər Quran hafizi, Allah uğrunda döyüşmüş biri və malı-dövləti çox olan biridir. Onları Allah sorğu edərək niyyətlərinin həqiqətdə özlərini insanlara göstərmək olduğunu bildirir və sonra onların atəşə atılmaqlarını əmr edir. Hədisi tam rəvayət etdikdən sonra əl-Valid Əbu

[59] "Musnəd əş-Şəmiyyin", 3/250 (2191);

Osman dedi: “**Uqbə bin Muslim mənə xəbər verdi ki, Müaviyənin yanına daxil olub ona bu hədisi rəvayət edən məhz Şufey idi. (əl-Valid) Əbu Osman dedi: əl-Alə bin Əbi Həkim mənə rəvayət etdi ki, o, Müaviyə üçün səyyaf olduqda bir nəfər onun yanına daxil oldu və bu hədisi Əbu Hureyra’dan ona rəvayət etdi. Buna görə Müaviyə dedi: “Əgər bunlara bu ediləcəksə o zaman yerdə qalan insanların halı görəsən necə olacaq?! Sonra Müaviyə o qədər şiddətli şəkildə ağlamağa başladı ki, öləcəyini güman etdik və dedik ki, o adam bizə şər gətirdi. Sonra Müaviyə sakitləşdi və üzündəkiləri sildi və dedi: Allah və elçisi doğru söyləyir: “Kim dünya həyatını və onun bərbəzəyini istəyirsə onlara əməllərinin əvəzini orada tam verərik və onlar orada zərər çəkməzlər. Onlar axirətdə özləri üçün oddan başqa heç bir şeyi olmayan kimsələrdir. Onların dünyada gördükləri işlər boşa çıxar və tutduqları əməllər puç olar.**” (Hud, 15-16)”

## HƏNƏFİ MƏZHƏBİNİN MÜNASİBƏTİ

Müaviyə həm yuxarıda haqqında zikr etdiyimiz səbəblərə görə, həm də ümumən səhabələrdən biri olduğuna görə məzhəb alimləri tərəfindən sevilib sayılıb. Hənəfi alimləri bu baxımdan müstəsna olmayıblar. Hənəfilərin ümumən səhabələrə münasibəti ənənəvi olaraq müsbət olub və Müaviyə'ni bu münasibətdən kənarda tutmayıblar. "əl-Fiqh əl-Əkbər" kitabında Əbu Hənifəyə mənsub sözlər belədir: "**Səhabələri yalnız xeyir ilə yad edirik.**" Bir nüsxəsində isə bu cür keçir: "**Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səhabələrindən heç birini xeyirdən başqa bir şey ilə yad etmirik.**"[60] Əbu Hənifə'nin bu sözlərini şərh edən hənəfi alimləri bu sözlərin bütün səhabələri fərdi olaraq əhatə etdiyini qeyd edirlər. Həmçinin böyük hənəfi alimi Əbu Cəfər ət-Tahavi əqidə kitabında deyir: "**Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səhabələrini sevirik və onlardan heç birini sevməkdə həddi aşmırıq, onlardan heç birindən bəraət etmirik. Onlara nifrət edənlərə, xeyirdən başqası ilə onları yad edənlərə nifrət edirik. Biz onları yalnız xeyir ilə yad edirik. Onları sevmək dindir, imandır və ihsandır və onlara nifrət etmək küfrdür, nifaqdır və tüğyandır.**"[61] Bu mətni şərh edən hənəfi alimləri heç bir səhabəni bu ümumdan istisna etmirlər, əksinə bütün səhabələrin bura daxil olduğunu vurğulayırlar.

Müaviyəyə gəldikdə isə hənəfi alimləri onu digər səhabələrin arasında zikr edirlər və ona rəhmət oxuyurlar. Kitablarında onun adını çəkdikdən sonra "Allah ondan razı olsun!" deyərək onun üçün dua edirlər. Onunla Əli arasında baş verən müharibələrdə onu xətasında üzrlü sayırlar. Əbul-Muin Məymun bin Muhəmməd ən-Nəsəfi (h. 438-508) deyir: "**Əgər hal belədirsə o zaman Müaviyənin xəta etdiyi aşkardır, lakin sadəcə olaraq o, etdiyini təvil əsasında edib və izah etdiyimiz kimi bununla**

---

[60] "əl-Aqidə va İlmul-Kələm min Aməlil-İməm Muhəmməd Zahid əl-Kəvsəri", səh: 621;

[61] "Mətnul-Aqidətit-Tahaviyyə", (122)

**fasiq olmayıb.**” Növbəti səhifədə deyir: “**Rafizilərin zalım, fasiq və bunun kimi adları verməklərinə önəm vermək olmaz...**”[62] Yəni rafizilərin Müaviyəyə bu adları verməklərinin bir dəyərinin olmadığını deyir.

Hənəfi üləmasından Aliyyul-Qari deyir: “**Sonra Müaviyə də (Əliyə müxalifət göstərdiyi üçün) xətalı idi, lakin etdiyini təvilə əsasən etmişdi, buna görə fasiq olmamışdı. Əhlüs-Sünnət val-Camaat onu “bağı” adlandırmaqda ixtilaf ediblər, onlardan bəziləri bu cür adlandırmaqdan imtina ediblər, lakin bu adı işlədənlər haqlıdırlar.**”[63] İki səhifə sonra deyir: “**Müsəlmanların ilk məliki Müaviyə - radiyallahu anhu – olub və o, (məliklar arasında) onların ən əfzəlidir.**” Əbul-Muntəhə Əhməd bin Muhəmməd əl-Məğnisəvi əl-Hənəfi “əl-Fiqh əl-Əkbər” kitabının şərhində deyir: “**Allahın elçisinin – salləllahu aleyhi va salləm – səhabələrindən heç birini xeyirdən başqa bir şey ilə yad etmirik.” (Əbu Hənifə’nin) qəsdi budur ki, əhlüs-sünnə val-cammaatın etiqadı səhabələrin hamısını təzkiyə etməkdir və Allahu Təalənin, elçisinin onları təriflədiyi kimi onları təriflənəkdir. Əli ilə Müaviyə arasında baş verənlər isə ictihad üzərində qurulmuşdu.**”[64]

Əhlüs-sünnətin digər alimlərinə müvafiq olaraq hənəfilər də səhabələr arasında baş verən münaqişələri qurdalamağı qadağan edirlər. Əbu Mənsur əl-Məturidi deyir: “**Allah bizim qılınclarımızı o fitnədən qoruduğu kimi bizim də dilimizi onlardan qorumağımız ən salamat olanıdır.**”[65] Cələluddin Ömər bin Muhəmməd bin Ömər əl-Xabbəzi əl-Xacəndi əl-Hənəfi (h. 629-691) “əl-Hədi fi Usulid-Din” adlı kitabında deyir: “**Sonra səhabələrə tən etməkdən dili qorumaq sünnət və camaat məzhəbinin üsulundandır, ona görə də onlardan təni dəf edəcək şəkildə xəbərlərini yozmaq və onlar haqqında pis zənn etməmək vacibdir. Gözəl zənnin tələbinə müxalif olacaq şəkildə onlardan rəvayət olunan hekayələrə gəldikdə isə əksəriyyəti təəssübə əsasən uydurulub, heç bir əsli yoxdur. Nəql baxımından sabit olanları isə təvil etmək mümkündür. Beləliklə də Aişə -**

---

[62] “Təbsiratul-Ədillə fi Usulid-Din”, 2/1172-1173;
[63] “Minəhur-Ravd əl-Əzhəri fi Şərhil-Fiqhil-Əkbər”, səh: 200;
[64] “Şərh əl-Fiqh əl-Əkbər”, səh: 140;
[65] “Şərh əl-Fiqh əl-Əkbər”, səh: 10;

**radiyallahu anhə - haqqında hüsnü zənn etmək vacibdir ki, o, fitnəni söndürməyə çalışırdı, lakin vəziyyət kontroldan çıxır və işin sonu əvvəlində istənilən məqsədə uyğun olaraq qalmır. Eyni şey Müaviyə - radiyallahu anhu – ilə də bağlıdır ki, o, etdiklərini təvil və gümana əsasən edib. Çünki onlar dini özlərindən sonrakılara nəql edənlərdir və bəşəriyyətin ən xeyirlisinə yoldaşlıq etməklə şərəflənmişlərdir, öz canlarını və mallarını Allahın dininə zəfər qazandırmaq üçün fəda ediblər.**"[66] Həmçinin İbn Əmir Həcc adı ilə tanınan hənəfi alimi Əbu Abdilləh Şəmsuddin Muhəmməd bin Muhəmməd deyir: "**Sonra Zun-Nureyn'dən sonra haqq imam Əli – kərraməllahu vachəhu – idi, Müaviyə - radiyallahu anhu – və onun camaatı təvil edirdilər. Səhabələrdən eləsi də var idi ki, vəziyyət problemli göründüyü üçün hər iki tərəfdən kənar durdu. Onların hamısı ictihadlarının tələbi ilə əməl etdilər və onların hamısı – radiyallahu anhum – adildirlər...**"[67] Hənəfilərdən Saduddin ət-Təftəzəni deyir: "**Əliyə qarşı çıxanlar, haqq imama bir şübhəyə - Osmanın qatillərinə qisas tətbiq olunmamasına - əsaslanaraq baş qaldırdıqları üçün bağidirlər, lakin fasiq, kafir və ya zalım deyillər. Çünki onlar təvillə hərəkət etmişlər. Əgər onların bu təvilləri batildirsə, o zaman onlar haqqında yalnız ictihadda xəta etdikləri deyilə bilər. Bu isə - onları təkfir etmək bir tərəfə - heç onların fasiq olduqlarını deməyə belə imkan vermir. Bunun üçündür ki, Əli, Şam ordusuna lənət edən yoldaşlarını bundan mən etmiş və "Qardaşlarımız bizə qarşı (sadəcə) qiyam qaldırdı" demişdir".**"[68] Bir başqa kitabında deyir: "**Bilcümlə sələfin müctəhidlərindən və saleh alimlərindən Müaviyəyə və onun tərəfdarlarına lənət etməyin caiz olması nəql olunmayıb, çünki etdikləri ən pis halda bağilik və haqq imamın itaətindən çıxmaq olub; bu isə lənəti vacib etməz.**"[69] Beləliklə də İmam ət-Təftəzəni də Müaviyə və onun yoldaşlarının etdikləri xəta ilə fasiq olmadıqlarını təsdiqləyir.

əl-Kəməl İbnul-Huməm isə kitabında Müaviyə "alim bir imam" olaraq vəsf edir və deyir: "**Müaviyənin hekayəsinə gəldikdə isə bu, onun**

---

[66] "Kitəbul-Hədi fi Usulid-Din", səh: 296-297;
[67] "ət-Təqrir vat-Təhbir", 2/260-261;
[68] "Şərhul-Məqasid", 5/308;
[69] "Şərhul-Aqidətin-Nəsəfiyyə", səh: 124;

**səhih olmasından asılıdır və bu hekayə səhihlikdən çox uzaqdır, çünki bir kafirin dəyərsiz məqsədi üçün bir nəfəri azuqəsini təmin etməklə rum torpaqlarına göndərmək alim bir imamın etməyəcəyi bir şeydir**."[70] İbnul-Huməm nəql olunan bir xəbəri Müaviyə kimi bir səhabənin edə bilməyəcəyini əsas gətirərək rədd edir. Şübhəsiz ki, bu, Müaviyənin onun nəzərində tutduğu yüksək məqamdan xəbər verir.

Digər hənəfi alimi Əbul-Bərakət Həfizuddin Abdullah bin Əhməd ən-Nəsəfi (vəfatı hicri 710) deyir: "**(Talha və Zubeyr) etdiklərinə peşman olmuşdular, eləcə də Aişə etdiyinə peşman olmuşdu. Hicabı islanana qədər ağlayardı. Eləcə də Müaviyə də peşman olmuşdu və o, xətalı idi, amma etdiyini təvilə əsasən etmişdi və buna görə fasiq olmamışdı. Sonra şəkk yoxdur ki, Əliyə qarşı vuruşmuş səhabələr və qeyriləri (buna görə) nə kafir, nə də fasiq oldular.**"[71] Bu sözləri də özündən əvvəlki hənəfi alimlərinin sözlərinə müvafiqdir.

Bədruddin əl-Ayni əl-Hənəfi peyğəmbərin – salləllahu aleyhi va səlləm – Ammar haqqında - "**onu baği bir qrup öldürəcək, onları cənnətə çağıracaq, onlar isə onu atəşə çağıracaqlar**" – sözünü şərh etdikdə fərqli izahları zikr etdikdən sonra deyir: "**Bu barədə doğru cavab budur ki, onlar (yəni Müaviyə və əshabı) cənnətə dəvət etdiklərini – işin həqiqəti bunun əksinə olsa belə - güman edən müctəhidlər idilər, beləliklə də öz gümanlarına tabe olduqlarına görə onlara qınaq düşmür. Əgər soruşsan ki, "müctəhid əgər haqqa isabət edərsə ona iki əcr, xəta edərsə bir əcr düşür, bəs burada necə olacaq?" Deyərəm ki, dediyimiz qane edici cavabdır, səhabə haqqında bundan fərqli bir şey söyləmək layiq deyildir, çünki Allah – təalə - onları "siz insanlar üçün çıxarılmış ən xeyirli ümmətsiniz" sözləri ilə tərifləmiş, onlara fəzilət ilə şahidlik etmişdir və təfsir alimləri bu ayənin Muhəmmədin səhabələri haqqında olduğunu deyirlər.**"[72] əl-Ayni Müaviyənin öz ictihadında əcr qazanmadığı qənaətindədir, çünki ona çatmış dəlilə müxalif şəkildə ictihad etdiyini söyləyir. Kitabının axırında söylədiyi sözlər də bunu təsdiqləyir. Amma bununla belə ictihadına görə qınaq düşmədiyini deyir. əl-Ayni'nin mövqeyinin nə

---

[70] "Fəthul-Qadir", 5/131;

[71] "Şərhul-Umdə fi Aqidəti Əhlis-Sunnəti val-Cəməati əl-Musəmmə əl-İtiməd fil-İtiqad", səh: 504;

[72] "Umdətul-Qari Şərh Sahih əl-Buxari", 4/209;

qədər ziddiyyətsiz olması müzakirəyə açıqdır, amma fakt budur ki, o da digər hənəfi alimləri kimi Müaviyəni fasiq hesab etməmişdir, onu adil səhabələrdən sayıb. Eyni hədisin şərhində digər hənəfi alimi Əhməd bin İsmail əl-Kurani əl-Hənəfi (vəfatı hicri 893) deyir: "**Onun – "səhabələrdən heç biri cəhənnəmə dəvət etməz" sözünə gəldikdə isə bu, həqiqətən də elədir, lakin (peyğəmbərin) "onu atəşə çağıracaqlar" sözündəki muradı imama müxalif olmaq, batil iş görməkdir. Haqqın Əlinin tərəfində olması üzərində icma vardır. Beləliklə də haqq onun yanında idi, ona müxalif olan isə batil üzərində idi, lakin müctəhid batil üzərində olsa da buna görə günah qazanmaz. Hər bir müsəlmana bunu etiqad etmək vacibdir.**"[73]

Burada Şəmsul-Əimmə əs-Səraxsi'nin də sözlərini zikr etməyimiz yerinə düşür. O, "əl-Məbsut" kitabında deyir: "**Məsruq tabiilərin alimlərindəndir və fətvada səhabələrdən – radiyallahu anhu – geri qalmazdı, hətta İbn Abbas oğulu qurban gətirməyi nəzir etmək məsələsində onun görüşünə dönmüşdü. Lakin bununla belə Müaviyənin – radiyallahu anhu – rəyi onun rəyindən önə keçirilir... O, sahabələrin – radiyallahu anhum – böyüklərindən idi, vəhy katibi idi və möminlərin əmiri idi. Allahın elçisi – salləllahu aleyhi va səlləm – özündən sonra onun məlik olacağını xəbər vermişdi və ona demişdi: "Ümmətimin üzərində bir gün məlik olsan onlarla yaxşı davran!" Sadəcə olaraq onun növbəsi Əlinin – radiyallahu anhu – növbəsi bitdikdən və xilafət müddəti qurtardıqdan sonra idi. Lakin o, Əliyə - radiyallahu anhu – qarşı durduğu üçün, ona itaət etmək vacibiyyətini tərk etdiyi üçün xəta edib və onun haqqında bundan artığını demək icazəli deyildir.**"[74] Muhəmməd bin Əhməd əs-Səraxsi (vəfatı hicri 483) hənəfilərin ən məşhur alimlərindəndir.

Hənəfi fəqihlərindən Əbul-Həsən Aləuddin Əli bin Xalil ət-Tarablusi (vəfatı hicri 844) "Muinul-Hukkəm" adlı kitabında səhabələri söyənlər haqqında deyir: "**Onları söymək və onları eyibləmək haramdır, bunu edən lənətlənib. Peyğəmbərin – aleyhissalətu vassələm – səhabələrindən birini, Əbu Bəkri və ya Öməri və ya Osmanı və ya Əlini və ya Müaviyəni və ya Amr bin əl-Ası söyərsə, "onlar zəlalət və**

---

[73] "əl-Kəvsər əl-Cəri İlə Riyadi Əhədis əl-Buxari", 2/129;
[74] "əl-Məbsut", 24/46-47;

**küfr üzərində idilər" deyərsə öldürülər, amma bundan savayı insanların istifadə etdikləri söyüşlərdən biri ilə söyərsə şiddətli şəkildə cəzalandırılmalıdır.**"[75] Bir başqa hənəfi alimi Əbu Said Muhəmməd əl-Xadimi "Bəriqa Məhmudiyyə" adlı kitabında deyir: "**Əbu Suud fətvalarında Müaviyəni – radiyallahu anhu – söyən və ona tənə edən haqqında fətva istəndikdə onun şiddətli döyülməsini, düzəldiyi və səmimi tövbə etdiyi üzə çıxana qədər həbsə atılmasına fətva verdi.**"[76]

Əhməd ər-Rabbəni əs-Sirhindi (h. 971-1034) "əl-Məktubat" kitabında Seyyid Mahmuda yazdığı, kitabın 58-ci məktubunda səhabələrin mərtəbəsinin onlardan sonra gələn ən əfzəl insanlardan daha üstün olduğunu təsdiqləyir. Bu məqamda əl-Vəhşi'nin tabiinin ən xeyirlisi sayılan Uveys əl-Qarani'dən, Müaviyənin isə Ömər bin Abdilaziz'dən əfzəl olduğunu zikr edir. Hənəfi təfsir alimlərindən Əbus-Sənə Şihəbuddin Mahmud bin Abdilləh əl-Hüseyni əl-Alusi (h. 1217-1270) "Ruhul-Məani" adlı təfsirində bu mənanı təsdiqləyir. Həmçinin əl-Murtəda əl-Huseyni əz-Zəbidi (h. 1145-1205) "İthəfus-Sədətil-Muttəqin" kitabında Müaviyəni ictihadında üzrlü sayır.

---

[75] "Muinul-Hukkəm fimə Yətəraddədu beynəl-Xasmeyn minəl-Əhkəm", səh: 192;

[76] "Bəriqa Məhmudiyyə fi Şərhi Tariqatin Muhəmmədiyyə", 1/242

## TARİXÇİLƏRİN MÜNASİBƏTİ

Hənəfi alimlərinin sözləri ilə tanış olduqdan sonra belə bir sual üzərində düşünməyimiz lazımdır. Biz həqiqətən də tarixdən bizə gəlmiş xəbərlərin təhlilində haqlı olduğumuzdan əmin ola bilərikmi? Həqiqətən də tarixdə baş vermiş hadisələrdə şəxsiyyətlərin atdığı addımları arxasındakı motivlərdən əmin ola bilərikmi? Tarixçi alimlərimizin Müaviyə haqqında fikirlərini bilmək istəyənlər üçün onlardan bəzilərindən sitat gətirmək istəyirik. Əbu Bəkr İbnul-Arabi "əl-Avasim minəl-Qavasim" kitabında Müaviyənin məziyyətləri haqqında yazaraq deyir: "**Lakin Müaviyə'də bir neçə xüsusiyyət toplanmışdı: Ömər ondakı gözəl şəxsi özəllikləri, müsəlman torpaqlarını himayə etmək, cəbhə ərazilərini qorumaq, ordunu islah etmək, düşmənə üstün gəlmək və insanları siyasətlə idarə etmək bacarığını gördüyü üçün Şam torpaqlarının hamısını tək onun əmirliyi altında topladı. Səhih hədisdə onun fiqhinə və Ummu Haram'ın hədisində onun xəlifəliyinə şahidlik varid olub...**"[77] Əbul-Xattab İbn Dihyə əl-Kəlbi (vəfatı hicri 633) "Ələm ən-Nəsr əl-Mubin" kitabında Siffin döyüşünün təfsilatlarını qeyd edir, Əlinin haqlı olduğunu və o dövrdə ən fəzilətli səhabə olduğunu isbat edir və kitabının sonunda buyurur: "**Bütün bunlardan sonra; səhabələrə - Allah onlardan razı olsun – hörmət etmək hər bir müsəlmana vacibdir, amma onlardan fəzilətində geri qalan ilə fəzilətdə önə keçənlər eyni deyildir.** " İbn Dihyə bu sözləri ilə Müaviyənin Əlidən fəzilət baxımından geridə qaldığını deyir, lakin hər ikisinə də hörmət etməyi vacib görür. Sözünün davamında buyurur: "**Bilin ki, - Allah sizə rəhm etsin! – onları söymək və ya onlardan birini söymək ən böyük günahlardandır.**"[78] Tarix sahəsində fəaliyyət göstərmiş digər tanınmış alim Şəmsuddin əz-Zəhəbi deyir: "**Müaviyə ədaləti zülmünə qalib gəlmiş ən xeyirli sultanlardandır və o, günahlardan təmiz deyildir,**

[77] "əl-Avasim minəl-Qavasim", 1/202-206;
[78] "Ələm ən-Nəsr əl-Mubin fil-Mufədaləti beynə Əhli Siffin", səh: 155-156;

**Allah onu əfv etsin!**”[79] Eynilə İbn Kəsir deyir: “**(Müaviyə xəlifə seçildikdən sonra) bu müddətdə öldüyü ilə qədər hakimiyyətində müstəqil olmağa davam etdi və (son ilə qədər) düşmən torpaqlarında cihad aparılırdı, Allahın kəliməsi ali idi, ərazilərin hər tərəfindən qənimətlər axışırdı və müsəlmanlar onunla rahatlıq, ədalət və güzəşt içində idilər.**”[80] Bundan öncə isə onu belə vəsf edir: “**Mülayim, vüqarlı idi, insanların arasında bir avtoritet və ağa idi, comərd, adil və zəki idi.**”[81] əl-Qadi İbnul-Əzraq əl-Məliki tamamilə başqa bir mövzunun müzakirəsində Müaviyə haqqında fikrini bu cür ifadə edir: “**İndi görünür ki, hadisələrdə səbəb gətirilən qorxu, məkruhluğu aradan qaldırmaq üçün kifayət edir, çünki qorxunun reallaşması halında böyük fəsadlar ortaya çıxır. Xüsusilə də əgər Müaviyədən – radiyallahu anhu - gələn nəql səhihdirsə, o zaman burada bununla yanaşı (tabe olunacaq) bir nümunə vardır, çünki o, hörmətli bir səhabədir, Allahın elçisindən – salləllahu aleyhi va səlləm – sonra da daha öncəki səhabəlik və sabiqlik fəziləti üzərində qalmasına sünnət əhli şahidlik edir.**”[82] Tarixçi alimlərimiz Müaviyə haqqında varid olmuş xəbərlərdən agah idilər, amma buna baxmayaraq onun haqqında müsbət rəyə sahib idilər. Tarixçilərin ən barizlərindən olan İbn Xaldunun fikirləri də maraqlıdır. O deyir: “**Müaviyənin dövlətini və xəbərlərini xəlifələrin dövlətləri və xəbərlərinə qoşmaq lazımdır, çünki fəzilətdə, ədalətdə və səhabəlikdə onlardan sonra gəlir.**”[83]

İndi burada yuxarıda verdiyimiz suallara bir daha qayıdaq. Tarixi xəbərləri bizdən də gözəl bilən tarixçi alimlərimiz Müaviyə’nin şəxsiyyətinə müsbət bir mövqe göstəriblərsə siravi müsəlmanlardan biz başqa nə gözləyə bilərik?! Yuxarıda verdiyimiz sualın cavabı əslində budur ki, tarixi şəxsiyyətlərin siyasətləri, atdığı addımları arxasındakı maraq və motivlər haqqında yalnız zənn edə bilərik. Belə bir zənnin arxasına düşmək müsəlmanlar üçün necə əhəmiyyətli bir iş ola bilər axı?! Bu məqamda böyük islam alimi Əbu Zur’a ər-Razi’nin sözlərini

[79] “Siyər Əaləmin-Nubələ”, 3/159;
[80] “əl-Bidəyə van-Nihəyə”, 11/400;
[81] “əl-Bidəyə van-Nihəyə”, 11/397;
[82] “Bədə’i əs-Silk fi Tabə’i əl-Mulk”, 2/240;
[83] “Tərixu İbn Xaldun”, 2/650;

xatırlayıram. İbn Asəkir tarix kitabında isnadı ilə rəvayət edir ki, bir nəfər Əbu Zur'a ər-Razi'yə dedi: "**Mən Müaviyəyə nifrət edirəm." (Əbu Zur'a) ondan soruşdu: "Nə üçün?" Dedi: "Çünki o, Əliyə qarşı vuruşdu." Cavab olaraq Əbu Zur'a ona dedi: "Vay halına! Müaviyənin Rəbbi mərhəmətlidir və Müaviyənin rəqibi isə çox comərd bir rəqibdir. Sən nə üçün onların ikisinin – Allah hər ikisindən də razı olsun! – arasına girirsən?!**"[84]

Bu münasibətlə sözümüzün əvvəlində zikr etdiyimiz ayəni bir daha burada təkrarlayırıq: "**Onlar bir camaat idilər ki, keçib getdilər. Onların etdikləri əməllər özlərinə, sizin etdiyiniz əməllər isə sizə aiddir. Onların əməlləri barəsində sizdən sorğu-sual olunmaz.**"

[84] "Tərixu Diməşq", 59/141;